**UOT 631.39.631**

# AVASİ CİNSLİ TÖRƏDİCİLƏRDƏN AZƏRBAYCAN QOYUNÇULUĞUNDA İSTİFADƏ OLUNMASI

**B.Ş.RZAYEV**
**Azərbaycan Dövlət Aqrar Universiteti**

*Məqalə respublikamızın Qərb bölgəsində qoyunçuluğun inkişaf etdirilməsinə və məhsuldarlığın yüksəldilməsinə həsr olunur. Bu vəzifənin öhdəsindən gəlmək üçün Türkiyədən gətirilmiş Avasi cinsli qoyunlar və törədicilər üzərində tədqiqatlar aparılmışdır.*

***Açar sözlər:*** *Avasi, cins, məläz, süd məhsuldarlığı, ət çıxımı, təmiz yun çıxarı, laktasiya, məhsuldarlıq.*

Azərbaycan Respublikasının aqrar siyasətində heyvandarlığın inkişaf etdirilməsi mühüm məsələ kimi qarşıya qoyulmuşdur. Heyvandarlığın əsas sahələrindən və eləcə də respublikamızda ənənəvi istehsal sahəsi sayılan qoyunçuluğun inkişaf etdirilməsinə yaxından diqqət yetirilməsi ölkəmizdə iqtisadi və sosial tərəqqi vəzifələrinin yerinə yetirilməsində bu sahənin böyük rolu ilə izah olunur [1].

Azərbaycanda qış fəsli qoyunların saxlanılıb otarıldığı yerlərə qış otlaqları, yay fəsli saxlanıldığı yerlərə isə yay otlaqları deyilir. Otlaq yemi qidalılıq cəhətdən ən keyfiyyətli yemlərdəndir. Belə ki, bu yemlərin tərkibində heyvan orqanizminə lazım olan bütün qidalı maddələr, makro və mikro elementlər vardır. Qoyunlar üçün çox əhəmiyyət kəsb edən yay otlaqlarının ot örtüyünün botaniki tərkibini əsasən paxla fəsiləsi otları, müxtəlif tipli ot qarışıqları təşkil edir.

Respublikamızın Aran zonalarında yerləşən Mərkəzi aran, Qobustan, Mil-Muğan, Böyük düz, Ceyran çöl, Acınohur, Abşeron, Qarabağ düzənlikləri və s. yerlər qış otlağı kimi əsasən ilin qış fəsli, yazın əvvəllərində və payızın son aylarında qoyunlar tərəfindən istifadə edilirlər lakin Azərbaycanın qış otlaqlarının məhsuldarlığı çox aşağıdır. Bu zonalarda bitki örtüyü botaniki cəhətdən son dərəcə kasıb, ot durumu zəifdir [3] . Aprel ayının sonunda istilər düşdüyündən buralarda yeni cücərib çıxan, yaşıl otlar yanıb, tələf olur. Odur ki, respublikamızın əksər rayonlarında qoyunçuluq köçəri şəraitində inkişaf etdirilir. Aran otlağı yanıb, tələf olarkən qoyunlar yavaş-yavaş çoxqidalı təbii dağ otlaqlarına köçürülür. Burada qoyunlar sentyabrın axırına qədər bəslənilir.

Qoyunçuluq – heyvandarlığın ən mühüm sahəsidir. Qoyunlar, məhsuldarlığına görə müxtəlif istiqamətli olurlar. Onlardan ət, süd, dəri, xəz, piy və s. məhsullar alınır. Qoyunların yetişdirilməsində otlaqlardan tam və effektli istifadə olunmasına nail olunur [2].

Respublikamızın Qərb bölgəsində ilk dəfə olaraq, AzETHİ-nun təcrübə təsərrüfatına 2004-cü ildə 150 baş Türkiyədən Avasi cinsli qoyunlar və törədicilər gətirilmişdir. Hazırda həmin təsərrüfatda bu cinsdən 200 başadək məläz heyvanlar alınmışdır.

Avasi qoyunları əsasən Türkiyənin Şanlıurfa, Qaziantəp, Xatay bölgələrində, umumiyyətlə Türkiyə - Suriya sərhədi boyunca düzənlik yerlərində yetişdirilir.

Avasi cinsi yüksək süd məhsuldarlığına malik cinslər sırasında yer tutur. Bu cinsin baş və ayaqları qəhvə rəngdə olmaqla, bədəni əsasən ağ, bəzən də qəhvəyi rəngdədir. Qulaqlarının uzunluğu 17 smdək olmaqla, sallaqdır [5]. Yağlı quyruqludur. Balavermə qabiliyyəti elə də yüksək deyil. Hər yüz baş ana qoyundan 106-110 baş bala alınır. Ana qoyunların canlı kütləsi orta hesabla 44-48 kq, süd məhsuldarlığı 120-150 kq-dır. Yun qırxımı 2-3 kq, təmiz yun çıxarı 60-65%, saçağın uzunluğu 12-16 sm, yun telinin zərifliyi 32-35 mkm-dir.

Bu cins ərəb ölkələrində ən geniş yayılmış cinsdir. Ən çox Suriya səhralarında yayılmışdır [4].

Avasi cinsi ən çox Orta Asiyada – İordaniya, İrak, Suriya, Livan, Fələstin və İsraildə yetişdirilir. Bu cins həddindən artıq dözümlü cinsdir. Yerli şəraitə çox yaxşı uyğunlaşmaqla əsrlər boyu köçəri və oturaq şəraitdə yetişdirilmişdir. Bu yuxarıda göstərilən regionların əsas qoyun cinsi hesab olunur. Əsasən süd, ət və yun istehsalı mənbəyi sayılır [6]. Bu cins çox unikal fizioloji xüsusiyyətlərə malik olmaqla, xəstəliklərə və parazitlərə qarşı çox dözümlüdürlər.

Aşağı və yüksək temperaturu çox yaxşı keçirməklə, uzaq məsafəni yaxşı qət etmək və müxtəlif iqlim şəraitinə asan adaptasiya olma qabiliyyəti ilə səciyyələnirlər.

Qoyunlar kasıb ortaaralıq dənizi otlaqlarına yaxşı uyğunlaşmaqla, quyruqlarına dəvə hürgücündə

olduğu kimi, piy ehtiyyatı toplama qabiliyyəti ilə də fərqlənirlər.

Avasi cinsi müxtəlif istehsal sistemlərində, köçəri sürü halında, ayaqaltı yemqırıntıları ilə qidalanan südlük təsərrüfatlarında da istifadə edilir [7].

Avasi qoyunları yağlıquyruqlu, ətlik-südlük-yunluq məhsuldarlıq istiqamətlidir. Bu Ərəb yarımadasının aborigen qoyun cinsidir.

Avasi qoyunu öz adını Tiqr və Efrat vilayətləri arasında yerləşən beduin tayfalarından olan avas sözündən götürülmüşdür.

Avropanın cənub qərbində avasi alnoamiya adı ilə, cənub şərqində aljeravis adı ilə tanınır. Suriyada bu cinsi meamix, şami, beladi, deyri; İrakda – neymi, şafali adlandırırlar. Ədəbiyyatlarda hərdən avyasse, avasi, əl-avas, ivessi, oussi, ussi kimi də yazılır. Bədən quruluşu möhkəm olmaqla, başı iri, sifəti uzun, donqar burunlu olurlar. Erkəklər buynuzlu, analar buynuzsuz olur.

Avasi qoyunlarının quyruğu yağlı olub, muttəkəvari yığcam, quyruğun ucu nazik olur. Quyruğun çəkisi 4-5 kq, kökəldilmiş heyvanlarda ana qoyunlarda - 6 kq-dək, qoçlarda - 10 kq-dək olur.

Avasi qoyunları yüksək məhsuldarlığı ilə seçilirlər.

Bu qoyunlar tezyetişkən, yüksək köklük və yağlı quyruqları ilə xarakterizə olunurlar. Soyuq və qar örtüyünü pis keçirirlər. Əsəb sistemlərinin oyanıq tipində olması ilə xarakterizə olunur və təkliyə meyillidirlər.

Ana qoyunların cidov hündürlüyü 62,6-64,8 sm; doğulanda erkək quzuların canlı kütləsi 4,4-4,6 kq, dişi quzularda isə 4,3 kq; yaşlı qoçların çəkisi 70-75 kq, anaların canlı kütləsi 40 kq olur. Yaşlı qoyunların ət çıxarı 52 %-dir. Əti yüksək dadlıq keyfiyyətinə malikdir. Təmiz yun çıxarı 60-65 %-dir. Yunu xalçaçılıq sənayesi üçün əsas xammal mənbəyidir.

Laktasiya ərzində 130 -140 kq süd verir, ən yüksək sağım 808,5 kq-dək olur. Südün yağlılığı 7,5% olmaqla, pendirçilik sənayesi üçün əvəzolunmaz xammalıdır. Laktasiyanın əvvəlində 100 kq qoyun südündən 31 kq qoyun pendiri, laktasiyanın sonunda 100 kq qoyun südündən 6,7 kq əridilmiş yağ alınır.

Ona görə də, Avasi qoyun cinsinin yetişdirilməsində seleksiya damazlıq işləri əsasən süd məhsuldarlığı istiqamətində aparılır.

Avasi qoyunlarının yüksək ətlik və südlük məhsuldarlığını nəzərə alaraq, biz AzETHİ-nın yardımçı təsərrüfatında yetişdirilən Bozax cinsli qoyunların süd, ət məhsuldarlığını və s. bioloji xüsusiyyətlərini yüksəltmək üçün 50 baş ana qoyun seçib (təcrübə) Avasi cinsli törədicilərlə cütləşdirmişik. Alınan dişi balalar 16-15 aylığında cütləşdirməyə buraxılmış və dekabr-yanvar aylarında mələz qoyunlardan alınan balaların böyümə və inkişaf dinamikası, mələz anaların südməhsuldarlığı öyrənilmişdir.

Qoyunların laktasiya müddəti onların cinsindən, yemləmə-bəsləmə şəraitindən, fərdi xüsusiyyətindən asılı olaraq 5-6 ay davam edir. Yaxşı yemləmə və bəsləmə şəraitində, ixtisaslaşmış südlük qoyunçuluq təsərrüfatında bu müddət uzana da bilər. Təcrübə zamanı Bozax cinsli ana qoyunlar 20 baş, həmçinin Avasi x Bozax mələz ana qoyunlarda 20 baş olmaqla süd məhsuldarlığı müqayisəli sürətdə öyrənilmişdir.

Bozax qoyunlarının süd məhsuldarlığı aşağıdakı cədvəldə verilmişdir.

**Cədvəl 1**

**Bozax qoyunlarının süd məhsuldarlığı (kq)**

| **Laktasiya ayları** | **Gündəlik süd sağımı** | **Ay ərzində** | **Süddə yağ %-i** |
|---|---|---|---|
| I | 0,44±0,01 | 13,2 | 4,7 |
| II | 0,40±0,015 | 12,0 | 4,9 |
| III | 0,38±0,015 | 10,4 | 5,6 |
| IV | 0,30±0,018 | 9 | 6,5 |
| V | 0,26±0,021 | 7,8 | 6,9 |
| VI | 0,20±0,014 | 6,0 | 7,1 |
| Laktasiya ərzində - 0,33 (orta) | 0,33 (orta) | 58,2 (cəmi) | 5,6 (orta) |

Cədvəldən göründüyü kimi Bozax qoyunlarının süd məhsuldarlığı xırda çəkili qoyun cinslərinə xarakterikdir. Bununla yanaşı qoyunlar sağılarkən südün 30%-ni balası üçün saxladığını nəzərə alsaq, onda Bozax cinsli ana qoyunların süd məhsuldarlığı rta hesabla 70 kq təşkil edir.

Təcrübə təsərrüfatında yetişdirilən Avasi qoyunlarının sutkalıq və əmtəəlik süd məhsuldarlığını təyin etmək üçün hər bir qoyunlar fərdi olaraq sağılmış və onların südü xüsusi kitabda invertar №–si ilə qeyd edilmişdir, buna əsasən 6 ay sağılma müddətində cəmi süd məhsulu, o cümlədən satışa gedən süd müəyyən edilmişdir.

**Cədvəl 2**

**Avasi qoyunlarının süd məhsuldarlığı (*n=20*)**

| Cinsi | Laktasiya ərzində süd, kq | | Südün orta yağ %-i | Orta gündəlik sağım, kq $\bar{X}$±m |
|---|---|---|---|---|
| | Cəmi süd, $\bar{X}$±m | Əmtəəlik süd, $\bar{X}$±m | | |
| Avasi | 151,8±6,2 | 85,5±2,8 | 7,15±0,03 | 0,02±0,01 |
| Avasi x Bozax | 117,4±4,9 | 68,8±1,9 | 7,05±0,02 | 0,81±0,01 |

Cədvəldən göründüyü kimi Avasi qoyunları laktasiya ərzində 151,8 kq süd vermişdir ki, bunun da 85,5 kq əmtəəlik məqsədi ilə istifadə edilmişdir. Orta sutkalıq sağım isə hər başdan 0,92 kq olmuşdur.

Avasi mələz qoyunlarının süd məhsuldarlığı müvafiq olaraq 117 kq, əmtəəlik süd isə 68,8 kq ol-

muşdur. Sutkalıq süd sağımı 0,81 kq, südün yağlılığı müvafiq olaraq 7,15±0,03, 7,05±0,02% olmuşdur.

Beləliklə tədqiqatlarla məlum olmuşdur ki, Avasi cinsli törədicilərdən istifadə etməklə Azərbaycanda yetişdirilən qoyun cinslərinin süd məhsuldarlığını və südün keyfiyyətini yaxşılaşdırmaq mümkündür.

**Nəticə.**Türkiyədən gətirilmiş Avasi cinsli törədicilərdən istifadə etməklə, respublikamızın Qərb bölgəsində yetişdirilən Bozax cinslı qoyunların süd məhsuldarlığını və südün keyfiyyətini yaxşılaşdərmaq mümkündür.

Gələcəkdə bu cinslərdən istifadə olunmasını məqsədə uyğun hesab edirik.

**ƏDƏBİYYAT**

1. Abdullayev Q.Q. "Qoyunçuluq". Bakı, "Yazıçı" nəşriyyatı, 2014, 452 s. 2. Abdullayev Q.Q., Cəfərov P.A. "Azərbaycanda qoyunçuluğun son 40 ildə aparılan kəmiyyət və keyfiyyət dəyişiklikləri". ("Müstəqil Azərbaycanda H.Əliyev Aqrar siyasəti" mövzusunda Ümum Respublika elmi konfransının praktik materialları. 28-30 aprel). AKTA, Gəncə 2008, səh. 25-27. 3.Abdullayev Q.Q., Səfərov X.M. "Azərbaycanda qış otlaqlarının bitki örtüyü". XVII Ulusal bioloji konqres. 21-24 s. Haziran 2004, Çukurova Universiteti, Adana. 1. 4. Awassi. Breeds of Livestock. Oklahoma State University, Dept. of Animal Science. Проверено 14 мая 2009. Архивировано 5 сентября 2012 года. 5. (October 11 - 13, 2006) «Awassi Sheep Production and the Development of breeding Program Options in Syria» (PDF) (Humboldt University). Проверено 2011-12-05. 6. Awassi/Israel. Breed Data Sheet. Domestic Animal Diversity Information System. Проверено 5 декабря 2011. Архивировано 5 сентября 2012 года. 7. Awassi Sheep A Rare Breed of Middle East Origin. Rare Breeds Conservation Society of New Zealand. Проверено 5 декабря 2011. Архивировано 5 сентября 2012 года.

**Использование баранов производителей Авассии в овцеводстве Азербайджана.**

**Б.Ш.Рзаев**

Представленная статья посвящена путем изыскания увеличения производства и качества овец, разводимой в Западной зоне Азербаджанской республики. Для решения этого вопроса целесообразно использовать породы Авасси привезенных из Турции.

***Ключевые слова:*** *Авасси, порода, помесь, моллочная продуктивность, убойный выход, выход чистой шерсти, лактация, продуктивность.*

**Use of Avasi breed sves in Azerbaijan sheep breeding**

**B.Sh.Rzayev**

It is impossible to improve dairy productivity and milk quality of Bozakh breed sheep grown in the Western part of our republic by using Avasi breed sires brought from Turkey.

We consider it apporopriate to use theese breeds in the future.

***Key words:*** *Avasi, hibrid, half-breed, milk productivity, meat productivity, clean wool extract, lactasion, productivity.*